ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)

JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 1, Say 2, Sıra 2, 2020, 26-33

# NATIONAL LEADER HEYDAR ALIYEV'S CONTRIBUTION TO THE FORMATION OF THE STRATEGIC PARTNERSHIP BETWEEN AZERBAIJAN AND GEORGIA

**Kamal Salayev**[1]

УДК 327.
КВТ 63.3 -6

## Keywords:

Azerbaijan
Georgia
National Leader
Heydar Aliyev
President Ilham Aliyev
Friendly relations
Diplomatic relations
Strategic partnership
Albanian monuments
Georgian monuments
Falsification of history
Armenian falsification

## ABSTRACT

The article examines the thought-out policy of national leader Heydar Aliyev in the development of friendly and cooperative relations between Azerbaijan and Georgia and the role of President of the Republic of Azerbaijan Ilham Aliyev, who duly continues this policy. It should be noted that the establishment of diplomatic relations between Azerbaijan and Georgia took place on november 18, 1992, the Georgian embassy in Baku was opened in february 1995, and the Azerbaijani embassy in Tbilisi was opened in march 1996. In march 1996, national leader Heydar Aliyev paid an official visit to Georgia, during which the Georgian declaration was signed. On march 14, 2008, Georgia voted at the UN General Assembly to adopt resolution 62243 on the situation in the occupied territories of Azerbaijan, which once again proves the strong ties of friendship and cooperation between the two countries. It should be noted that President Ilham Aliyev, who duly continued the political course of national leader Heydar Aliyev, paid an official visit to Georgia in june 2004, and in february 2019, President of Georgia Salome Zurabishvili paid an official visit to our country. The article also discusses the falsification of Georgian and Albanian monuments by armenians. From this point of view, reference was made to prominent public figures of the time, such as Vasily Velichko, Pushkin and Ilya Chavchavadze, and the falsification of historical stones by armenians was exposed in a workshop in Kalbajar.

[1]. ANAS, Institute of the Caucasian Studies
kamalsalayev1988@gmail.com

*Received: 24.09.2020*
*Accepted: 08.12.2020*

# AZƏRBAYCANLA GÜRCÜSTANIN STRATEJİ TƏRƏFDAŞLIĞININ FORMALAŞMASINDA ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN XİDMƏTİ

**Kamal Salayev**[1]

УДК 327.
КВТ 63.3 -6

**Açar sözlər:**

Azərbaycan
Gürcüstan
Ümummilli lider Heydər Əliyev
Prezident İlham Əliyev
Dostluq münasibətləri
Diplomatik əlaqələr
Strateji tərəfdaşlıq
Alban abidələri
Gürcü abidələri
Tarixin saxtalaşdırılması
Erməni saxtakarlığı

**ANNOTASİYA**

Məqalədə Azərbaycanla Gürcüstan arasındakı dostluq və əməkdaşlıq münasibətlərinin inkişafında ümummilli lider Heydər Əliyevin düşünülmüş siyasəti və həmin siyasəti layiqincə davam etdirən Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin rolu tədqiq olunmuşdur. Qeyd etmək lazımdır ki, Azərbaycanla Gürcüstan arasındakı diplomatik əlaqələrin qurulması 1992-ci ilin noyabr ayının 18-də baş vermis, 1995-ci ilin fevral ayında Gürcüstanın Bakıdakı səfirliyi açılmış, 1996-cı ilin mart ayında isə Azərbaycanın Tbilisidəki səfirliyi açılmışdır. 1996-cı ilin mart ayında ümummilli lider Heydər Əliyevin Gürcüstana rəsmi səfəri olmuş, həmin səfər zamanı Gürcüstan bəyannaməsi imzalanmışdır. 2008-ci ilin martın 14-də Gürcüstan BMT-nin Baş Assambleyasının iclasında "*Azərbaycanın işğal olunmuş ərazilərində vəziyyət*" haqqında olan 62243 saylı qətnamənin qəbul olunmasına səs vermişdir ki, bu da hər iki ölkə arasındakı möhkəm dostluq və əməkdaşlıq əlaqələrinin olduğunu bir daha sübut edir. Qeyd etmək lazımdır ki, ümummilli lider Heydər Əliyevin siyasi kursunu layiqincə davam etdirən Prezident İlham Əliyev 2004-cü ilin iyun ayında Gürcüstana rəsmi səfər etmiş, 2019-cu ilin fevralında isə Gürcüstanın Prezidenti xanım Salome Zurabişvilinin ölkəmizə rəsmi səfəri olmuşdur. Məqalədə həmçinin, ermənilərin gürcü və alban abidələrini saxtalaşdırmasından bəhs olunmuşdur. Bu baxımdan Vasili Veliçko, Puşkin və İlya Çavçavadze kimi dövrün görkəmli ictimai xadimlərinə istinad olunmuş, Kəlbəcərdəki sexdə ermənilərin tarixi daşları saxtalaşdırması ifşa olunmuşdur.

[1]. AMEA, Qafqazşünaslıq İnstitutunun Gürcüstanşünaslıq şöbəsinin mütəxəssisi
kamalsalayev1988@gmail.com

*Məqalə redaksiyaya daxil olmuşdur: 24.09.2020*
*Təkrar işlənməyə göndərilmişdir: 07.10.2020*
*Çapa qəbul edilmişdir: 08.12.2020*

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)



# ЗАСЛУГА ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА В ФОРМИРОВАНИИ СТРАТЕГИЧЕСКОГО ПАРТНЕРСТВА АЗЕРБАЙДЖАНА И ГРУЗИИ

**Камал Салаев**[1]

УДК 327.
КВТ 63.3 -6

**Ключевые слова:**

Азербайджан
Грузия
Общенациональный лидер Гейдар Алиев
Президент Ильхам Алиев
Дружеские отношения
Дипломатические отношения
Стратегическое партнерство
Албанские памятники
Грузинские памятники
Фальсификация истории
Армянская фальсификация

**РЕЗЮМЕ**

В статье была изучена продуманная политика общенационального лидера Гейдара Алиева в развитии отношений дружбы и сотрудничества между Азербайджаном и Грузией и роль Президента Азербайджанской Республики Ильхама Алиева, достойно продолжающего эту политику. Следует отметить, что установление дипломатических отношений между Азербайджаном и Грузией произошло 18 ноября 1992 года, в феврале 1995 года было открыто посольство Грузии в Баку, а в марте 1996 года-посольство Азербайджана в Тбилиси. В марте 1996 года состоялся официальный визит общенационального лидера Гейдара Алиева в Грузию, в ходе которого была подписана Грузинская декларация. 14 марта 2008 года Грузия на заседании Генеральной Ассамблеи ООН проголосовала за принятие резолюции № 62243 о "положении на оккупированных территориях Азербайджана", что еще раз доказывает наличие прочных связей дружбы и сотрудничества между двумя странами. Следует отметить, что Президент Ильхам Алиев, достойно продолжающий политический курс общенационального лидера Гейдара Алиева, в июне 2004 года совершил официальный визит в Грузию, а в феврале 2019 года состоялся официальный визит в нашу страну Президента Грузии Саломе Зурабишвили. В статье также говорится о фальсификации армянами грузинских и албанских памятников. В связи с этим, в статье, посвященной видным общественным деятелям того времени, таким как Василий Величко, Пушкин и Илья Чавчавадзе, была разоблачена фальсификация армянами исторических камней в Кяльбаджаре.

[1]. НАНА, Институт кавказоведения
kamalsalayev1988@gmail.com

## GİRİŞ

Azərbaycan ilə Gürcüstan arasındakı yaxın münasibətlər təkcə ölkənin coğrafi yaxınlığı ilə yox, eləcə də ölkələrarası sıx dostluq münasibətlərinin olması ilə də bağlıdır. Ümummilli lider Heydər Əliyevin də qeyd etdiyi kimi minlərlə fakt, nümunə Azərbaycan və Gürcüstan xalqlarının tarix boyu davam edən dostluğunu təsdiq edir. Bu baxımdan Nəriman Nərimanov, Niyazi və Rəşid Behbudov kimi ictimai xadimlərin Tiflisdə anadan olmasını da qeyd etmək olar.

**Azərbaycanla Gürcüstan arasındakı əlaqələrin qurulması**

Azərbaycanla Gürcüstan arasındakı diplomatik əlaqələrin qurulması [1] 1992-ci ilin noyabr ayının 18-də baş vermişdir. Bu hadisənin məntiqi davamı olaraq Gürcüstanın Bakıdakı səfirliyi 1995-ci ilin fevral ayında, Azərbaycanın Tbilisidəki səfirliyi isə 1996-cı ilin mart ayında açılmışdır.

Ümummilli lider Heydər Əliyevin hakimiyyətə qayıdışından sonra 1993-cü ilin iyunun 15-dəki ilk çıxışı zamanı [2] Azərbaycanla Gürcüstan arasındakı qarşılıqlı əlaqələrin inkişaf etdirilməsinin zəruriliyini bildirmiş, iqtisadi əlaqələrimizin, mədəni əlaqələrimizin, insani əlaqələrimizin uzun illər boyu, yüz illiklər ərzində çox yaxın olduğunu qeyd etmişdir. Hər iki dövlətin prezidentlərinin qarşılıqlı rəsmi səfərləri sayəsində ölkələrarası dostluq və əməkdaşlıq münasibətlərinin inkişafı daha da sürətlənmişdir. Bu baxımdan ümummilli lider Heydər Əliyevin Gürcüstana 1996-cı ilin martında etdiyi ilk rəsmi səfərini qeyd etmək olar. Qeyd etmək lazımdır ki, məhz həmin səfər zamanı tərəflər - [1] dostluq, əməkdaşlıq və qarşılıqlı təhlükəsizliyin möhkəmləndirilməsi haqqında müqaviləni, eləcə də Qafqaz regionunda sülh, təhlükəsizlik və əməkdaşlıq haqqındakı bəyannaməni imzalamışlar. 1996-cı ilin martın 8-də ümummilli lider Heydər Əliyevin Gürcüstana səfəri zamanı imzalanmış Gürcüstan bəyannaməsi [3] respublikamızın Qafqazdakı xarici siyasətinin mühüm nailiyyətlərindən biri olmuşdur. İki dövlət başçısının Tbilisidə imzaladığı birgə bəyannamə həmçinin, "Ümumqafqaz evi" ideyasının həyata keçirilməsinin başlanğıcı olmuşdur. Azərbaycanın sosial-iqtisadi inkişafı, siyasi inkişafa səbəb olan qlobal iqtisadi layihələrin həyata keçirilməsi istiqamətində atılan addımlar və dövlətimizin sülhsevər siyasəti həmin ideyanın həyata keçirilməsi üçün əlverişli zəmin yaratmışdır. Lakin Ermənistanın təcavüzkar siyasəti nəticəsində Dağlıq Qarabağ münaqişəsinin həllinin uzanması, "Ümumqafqaz evi" [3] ideyasının reallaşmasını xeyli çətinləşdirmişdir. Azərbaycan dövlətinin "Ümumqafqaz evi" ideyasının təşəbbüsü bu gün də öz aktuallığına görə gündəlikdən çıxarılmamışdır. Ümummilli lider Heydər Əliyev çıxışları zamanı Azərbaycanın xarici siyasəti və iqtisadi inkişafı ilə yanaşı, həmçinin, Ermənistanın hərbi təcavüzünü və Dağlıq Qarabağ münaqişəsini xüsusi olaraq vurğulamışdır. Bu baxımdan Gürcüstanın səlahiyyətli şəxsləri də Dağlıq Qarabağ münaqişəsi ilə bağlı Azərbaycanı dəstəkləkləmişlər. Qeyd etmək lazımdır ki, Gürcüstan BMT-nin Baş Assambleyasının [4] 2008-ci ilin martın 14-də keçirilən iclasında "Azərbaycanın işğal olunmuş ərazilərində vəziyyət" haqqında olan 62243 saylı qətnamənin qəbul olunmasına səs verən ölkələrdən biri olmuşdur. Həmin qətnamədə isə bir daha Azərbaycan Respublikasının beynəlxalq aləmdə tanınmış sərhədləri daxilində suverenliyinə və ərazi bütövlüyünə hörmət edilməsi və dəstək verilməsi bəyan edilməklə yanaşı, Azərbaycan Respublikasının bütün işğal olnumuş ərazilərindən bütün erməni qüvvələrinin dərhal, tam və qeyd-şərtsiz çıxarılması tələb olunur, eləcə də heç bir dövlətin Azərbaycan Respublikasının ərazilərinin işğalı nəticəsində yaranmış qanuni vəziyyəti tanımamasının, bu

vəziyyətin qorunmasına kömək göstərməməsinin vacibliyi qeyd olunur.
Qeyd etmək lazımdır ki, ulu öndərimiz Heydər Əliyevin siyasi kursunu layiqincə davam etdirən möhtərəm Prezidentimiz İlham Əliyev, Gürcüstanla əlaqələrin inkişafı məsələsində də mühüm rol oynamışdır. Bu baxımdan Gürcüstanın sabiq Prezidenti Mixeil Saakaşvilinin [5] 2004-cü ilin martın 4-də Azərbaycana etdiyi rəsmi səfərini misal olaraq göstərmək olar. Həmin səfər zamanı Azərbaycan Prezidenti İlham Əliyevlə Gürcüstanın sabiq Prezidenti Mixeil Saakaşvilinin arasında sənədlərin imzalanma mərasimi olmuşdur. Daha sonra ölkə başçıları, "Azərbaycan Respublikasının və Gürcüstanın birgə bəyannaməsi"ni imzalamışlar. Bununla yanaşı, Azərbaycan Respublikasının Təhsil Nazirliyi ilə Gürcüstanın Təhsil və Elm Nazirliyi arasında "Təhsil sahəsində əməkdaşlıq haqqında saziş", həmçinin, xarici işlər nazirləri arasında "İnformasiya sahəsində əməkdaşlıq haqqında saziş" imzalanmışdır. Həmin mərasimdə, hazırda AMEA-nın prezidenti, hörmətli akademikimiz Ramiz Mehdiyev, eləcə də Azərbaycanın Gürcüstandakı sabiq səfiri Hacan Hacıyev və Gürcüstanın Azərbaycandakı sabiq səfiri Zurab Qumberidze yaxından iştirak etmişlər. Mərasimdə [6] Azərbaycanla Gürcüstanın sadəcə dost və qonşu deyil, həm də qardaş ölkələr olduğu; iqtisadi layihələrin hər iki ölkənin energetika müstəqilliyi baxımından böyük əhəmiyyətə malik olduğu; Cənubi Qafqaz regionunda sülhün vacibliyi; təcavüzkarlığın, ekspansionizmin, işğalçılığın və separatçılıq hallarının qarşısının alınmasının vacibliyi, ictimai-siyasi sabitliyin bərqərar olmasının vacibliyi; hər iki ölkənin coğrafi-siyasi əhəmiyyətinin artmasının vacibliyi; ikitərəfli əlaqələrin möhkəmləndirilməsi baxımından strateji tərəfdaşlığın vacibliyi qeyd olunmuşdur.

**İlham Əliyevin Gürcüstana səfəri**

Möhtərəm Prezidentimiz İlham Əliyev 2004-cü ilin iyunun 14-də Gürcüstana [7] dövlət səfəri etmişdir. Prezident İlham Əliyev, ölkələrarası münasibətlərin uğurla inkişaf etdiyini, hər iki ölkənin arasında dostluq, qardaşlıq tellərinin olduğunu, hər iki ölkənin arasında qədim köklərə malik tarixi və mədəni əlaqələrin olduğunu, strateji tərəfdaşlığın olduğunu, iqtisadi və siyasi layihələrin, nəqliyyat layihələrinin olduğunu qeyd etmişdir. İyunun 15-də Prezident İlham Əliyev xanımı birinci vitse-prezident Mehriban Əliyeva ilə birlikdə Tbilisidəki Cümə məscidini ziyarət etmiş, Tbilisinin mərkəzindəki Heydər Əliyev adına parkın açılış mərasimində olmuşlar. İyunun 15-də Azərbaycan Prezidenti İlham Əliyev, Gürcüstanın sabiq Prezidenti Mixeil Saakaşvili ilə birlikdə [7] Marneuli rayonuna gedərək, oradakı azərbaycanlılarla görüş keçirmişlər. Yerli sakinlər dövlət başçılarını səmimiyyətlə qarşılamışlar. Həmin görüşdə möhtərəm Prezidentimiz İlham Əliyev, iyunun 15-də qeyd olunan Milli Qurtuluş gününün ümummilli lider Heydər Əliyevin adı ilə bağlı olduğunu bildirmiş, ölkənin xaosdan çıxaraq inkişafa doğru addımlar atmağa başladığını qeyd etmişdir. Prezident İlham Əliyev çıxışı zamanı azərbaycanlılarla gürcülərin bütün dövrlərdə sülh, əmin-amanlıq və dostluq şəraitində yaşadıqlarını vurğulamışdır.

2005-ci ilin mayın 24-25-də Bakı-Tbilisi-Ceyhan [8] əsas ixrac boru kəmərinin Azərbaycanda, oktyabrın 12-də isə Gürcüstanda baş tutan açılış mərasimində dövlət başçıları iştirak etmişlər. 2007-ci ilin mayın 12-də Prezident İlham Əliyev Gürcüstanın Tbilisi şəhərində ümummilli liderimiz Heydər Əliyevin şərəfinə salınan parkda ulu öndərimizin büstünün açılış mərasimində olmuş, həmin illin noyabrın 21-də Gürcüstanın Tetri-Skaro rayonunda Bakı-Tbilisi-Qars dəmir yolunun təməl qoyma mərasimində iştirak etmişdir. 2007-ci ilin iyunun 18-19-da Gürcüstanın sabiq Prezidenti Mixeil Saakaşvili Azərbaycanda keçirilən GUAM dövlət başçılarının zirvə toplantısında iştirak etmişdir. Gürcüstanın sabiq Prezidenti

Mixeil Saakaşvili 2008-ci ilin noyabrın 13-14-də Bakıda keçirilən Enerji sammitində iştirak etmiş, 2008-ci ilin iyulun 1-də isə Prezident İlham Əliyev GUAM dövlət başçılarının zirvə görüşündə iştirak etmişdir. 2009-cu ilin mayında Gürcüstanın sabiq Prezidenti Mixeil Saakaşvilinin Azərbaycana rəsmi səfəri olmuş, 2010-cu ilin iyulunda isə Prezident İlham Əliyevin Gürcüstana səfəri olmuşdur. 2012-ci ilin martında Gürcüstanın sabiq Prezidenti Mixeil Saakaşvilinin Azərbaycana rəsmi səfəri olmuş, 2013-cü ilin mayın 7-8-də isə Azərbaycanda keçirilən Cənubi Qafqaz Forumunda iştirak etmişdir. 2014-cü ilin fevralın 12-13-də Gürcüstanın sabiq Prezidenti Giorgi Marqvelaşvili Azərbaycanda rəsmi səfərdə olmuş, 2014-cü ilin mayın 6-da isə Prezident İlham Əliyev, Azərbaycan, Gürcüstan və Türkiyənin dövlət başçılarının Gürcüstanda keçirilən Üçtərəfli Sammitində iştirak etmişdir. 2015-ci ilin noyabrında Prezident İlham Əliyevin Gürcüstana rəsmi səfəri olmuş, 2016-cı ilin martın 10-11-də isə Gürcüstanın sabiq Prezidenti Giorgi Marqvelaşvili Azərbaycanda keçirilən [8] IV Qlobal Bakı Forumunda iştirak etmişdir. 2019-cu ilin fevralın 16-17-də Azərbaycanda keçirilən V Qlobal Bakı Forumunda Gürcüstanın hazırkı Prezidenti Salome Zurabişvili iştirak etmişdir.
Qeyd etmək lazımdır ki, 2019-cu ilin fevralın 27-də Gürcüstanın Prezidenti xanım Salome Zurabişvilinin möhtərəm Prezidentimiz İlham Əliyev tərəfindən ölkəmizdə qarşılanma mərasimi [9] olmuşdur. Daha sonra Gürcüstanın Prezidenti xanım Salome Zurabişvilinin şərəfinə verilən rəsmi ziyafətdə [10] Azərbaycanla Gürcüstan xalqlarının əsrlər boyu dostluq və mehriban qonşuluq şəraitində yaşadığı, hər iki ölkə arasında strateji tərəfdaşlığın olduğu, siyasi, iqtisadi və humanitar əlaqələrin yüksək səviyyədə olduğu qeyd olunmuşdur. Möhtərəm Prezidentimiz İlham Əliyev həmin ziyafətdə çıxış edərək, Bakı-Tbilisi-Ceyhan, Bakı-Supsa neft kəmərlərinin, o cümlədən, Bakı-Tbilisi-Ərzurum qaz kəmərinin böyük əhəmiyyətini, həmçinin, "Şahdəniz-2", Cənubi Qafqaz Kəməri və TANAP layihələrinin uğurla başa çatdığını qeyd etmişdir. Bundan əlavə, möhtərəm Prezidentimiz çıxışı zamanı 2017-ci ildə açılışı reallaşan Bakı-Tbilisi-Qars dəmir yolunun tarixi əhəmiyyətindən bəhs etmişdir. Möhtərəm Prezidentimiz həmçinin, çıxışı zamanı Azərbaycanla Gürcüstanın hər zaman bir-birinin ərazi bütövlüyünü dəstəklədiyini vurğulamış, Ermənistanın Azərbaycana qarşı davam edən təcavüzünü, Dağlıq Qarabağ regionunun hərbi işğal altında olmasını qeyd etmişdir.

Qeyd etmək lazımdır ki, Ermənistan bu gün qonşularının torpaqları və mədəniyyət abidələri hesabına özünə saxta tarix yazmağa çalışır. Bu baxımdan gürcü kilsələrinin ermənilər tərəfindən saxtalaşdırılmasını sübut olaraq göstərmək olar. Bu baxımdan görkəmli rus publisisti [11] Vasili Veliçko, ermənilərin gürcülərə məxsus tarixi-arxeoloji abidələri vicdansız şəkildə taladığını, həmin abidələrdən gürcü yazılarını sildiyini, hər daşı Gürcüstanın tarixi keçmişindən xəbər verən qədim kilsələri ələ keçirdiklərini qeyd edir.
Ermənistanın "Murç" jurnalı [11], ermənilərin başqa xalqları assimilyasiya etmək qabiliyyətindən bəhs edərək, artıq 90-cı illərin sonunda ermənilərin arasına assimilyasiya olunmuş xalqların böyük bir faizinin qaraçılardan ibarət olduğunu qeyd etmişdir.
Rus şairi, görkəmli dramaturq Puşkin ermənilər haqqında bu ifadəni işlətmişdir: "*Sən qorxaqsan, sən qulsan, sən ermənisən!*"
Bundan əlavə, gürcü xalqının arasında [11] belə bir deyim var: "Movida somexi – moytana sxva mexi" – bu deyimin mənası isə belədir: erməni gəldi və özü ilə yeni bir bədbəxtlik gətirdi. Zaqafqaziya tatarlarının arasında belə bir deyim var: "Bir erməninin yolunu işıqlandırmaq üçün on barmağınızı şam kimi yandırsazda o sizə təşəkkür etməz".
Ermənilər həyasızcasına, guya XII əsrə qədər Gürcüstanda gürcülərin olmadığını, burada guya ermənilərin və başqa xalqların olduğunu, hətta Gürcüstanın böyük bir

hissəsinin Tbilisi ilə birlikdə guya əsrlərdən bəri ermənilərə aid olduğunu qeyd edirlər. Bu barədə Gürcüstanın görkəmli ictimai xadimi [12] İlya Çavçavadze özünün “Erməni alimləri və ağlayan daşlar” əsərində ermənilərin tarixi saxtalaşdırmasını ifşa edərək qələmə alır. İlya Çavçavadze öz əsərində, haqlı olaraq, ermənilərin gürcü kilsələrində və monastırlarındakı gürcü mənşəli izləri silməyə, yox etməyə çalışdığını, gürcü yazılarını daşlardan silməyə, məhv etməyə çalışdığını, onların yerinə isə erməni yazısı olan saxta daşları gətirməyə çalışdıqlarını qeyd edir.

Qeyd etmək lazımdır ki, bu gün ermənilər gürcü abidələri ilə yanaşı, Dağlıq Qarabağdakı qədim alban abidələrini də saxtalaşdırmağa, oğurlamağa və öz adlarına çıxarmağa çalışırlar. Ermənilərin bu cür saxtakarlığına sübut olaraq, Kəlbəcərin ərazisində ermənilərin “tarix” istehsal edən [13] sexlərinin aşkarlandığını qeyd etmək olar. Həmin sexdə erməni ustaları daşların üzərində xaç işarələrini ovaraq, ona forma verməklə məşğul olurmuşlar. Daha sonra onlar bu “sənət əsərləri”ni bir müddət sirkə turşusunda saxladıqdan sonra həmin daşlar rəngini dəyişərək köhnə formaya düşürmüşlər. Ermənilər həmin saxta daşları gətirib Dağlıq Qarabağ ərazisində basdıraraq, hər kəsə buradakı abidələrin onlara məxsus olduğunu sübut etməyə çalışırlar.

## Nəticə

Qeyd etmək lazımdır ki, ermənilərin tariximizi dəfələrlə saxtalaşdırmaq cəhdlərinə baxmayaraq, onların yalanları peşəkarlar tərəfindən ifşa olunur, nəticədə isə onlar öz məqsədlərinə heç cür nail ola bilmirlər. “Böyük Ermənistan” xülyası ilə yaşayan ermənilər bu səfərdə məğlubiyyətə düçar oldular. Bu baxımdan möhtərəm Ali Baş Komandanmız İlham Əliyevin başçılığının və uzaqgörənliyinin sayəsində müzəffər Azərbaycan Ordusunun İkinci Qarabağ müharibəsindəki şanlı qələbəsini sübut olaraq göstərmək olar. Bu o müharibədir ki, ermənilərə unudulmaz bir sarsıdıcı zərbə vurdu. Bu həmin müharibədir ki, şanlı tariximizə əbədiyyən həkk olundu.

## ƏDƏBİYYAT SİYAHISI

1. Азербайджано-Грузинские отношения /23.04.2021/ https://ru.wikipedia.org/wiki/%D0%90%D0%B7%D0%B5%D1%80%D0%B1%D0%B0%D0%B9%D0%B4%D0%B6%D0%B0%D0%BD%D0%BE-%D0%B3%D1%80%D1%83%D0%B7%D0%B8%D0%BD%D1%81%D0%BA%D0%B8%D0%B5_%D0%BE%D1%82%D0%BD%D0%BE%D1%88%D0%B5%D0%BD%D0%B8%D1%8F
2. Heydər Əliyevin 15 iyun 1993-cü ildə Milli Məclisdə çıxışı /15.06.1993/ https://az.wikisource.org/wiki/Heyd%C9%99r_%C6%8Fliyevin_15_iyun_1993-c%C3%BC_ild%C9%99_Milli_M%C9%99clisd%C9%99_%C3%A7%C4%B1x%C4%B1%C5%9F%C4%B1
3. Азербайджан на международной арене /23.04.2021/ https://files.preslib.az/projects/azerbaijan/rus/gl8.pdf
4. Резолюция Генералъной Ассамблеи ООН 62243 /14.03.2008/ https://ru.wikipedia.org/wiki/%D0%A0%D0%B5%D0%B7%D0%BE%D0%BB%D1%8E%D1%86%D0%B8%D1%8F_%D0%93%D0%B5%D0%BD%D0%B5%D1%80%D0%B0%D0%BB%D1%8C%D0%BD%D0%BE%D0%B9_%D0%90%D1%81%D1%81%D0%B0%D0%BC%D0%B1%D0%BB%D0%B5%D0%B8_%D0%9E%D0%9E%D0%9D_62243
5. Gürcüstan Prezidenti Mixail Saakaşvilinin Azərbaycana rəsmi səfəri. Azərbaycan-Gürcüstan sənədlərinin imzalanması mərasimi /04.03.2004/ https://azertag.az/xeber/GURCUSTAN_PREZIDENTI_MIXAIL_SAAKASVILININ_AZARBAYCANA_RASMI_SAFARI_AZARBAYCAN_GURCUSTAN_SANADLARININ_IMZALANMASI_MARASIMI-307097?__cf_chl_jschl_tk__=2fad8b44fcfdcdf2847647b061cffeab1c193e91-1619170278-0-AUWwYXJdF9RnA0OH-bKjbU-Easj4XhwDQvIrtJuzhdMAgf2MDl0MYDP8lsspQV7_bGezrlJmvqNIZ43YfAncA75RbcsaNVpuRfmFAygap17GthxA_SHY7CaOeJUg3TDunioayj7QWI5mKbm41N7gyv0qwYaLUye4I08fJ5r9eSIEGZ5zV_qyFESHY4-

bioLT6KrjfdY56AW8xjvmQSG2AIS6zaceJWzIxJ_kWt2l_D2sXYuUxCs8WUYzdPI6-_YvC26vODS_zXwODMqeAhIbyGCOWGgWjinsiVGsVB7RSaD3gLk-JQdhdd_5NAHITI2og_aXo__Pc1pjCpWbzC1i2R7cPMBRPSrQ6bE0KwiauKG2WSa8H1Z6bA_NCIpGYckUEqwplCVhNxmpe4ARCOBvHj_6eyr2zgi1sO7Jy6ZRY6diIhHYGCX-S_SkitBssbu32aQwRS0N_Wip5VfEiPs9zkp9RsUizJezec_p1q0CNIHkLeardldZrBdloIxldTqMroDu1im6iGN8VCe9y6KU6Ftub9nX299RmYBWKczzwZ-J

6. Gürcüstan Prezidenti Mixail Saakaşvilinin Azərbaycana rəsmi səfəri. Gürcüstan Prezidenti Mixail Saakaşvilinin bəyanatı /04.03.2004/ https://azertag.az/xeber/GURCUSTAN_PREZIDENTI_MIXAIL_SAAKASVILININ_AZARBAYCANA_RASMI_SAFARI_GURCUSTAN_PREZIDENTI_MIXAIL_SAAKASVILININ_BAYANATI-307102
7. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin nitqləri, çıxışları, müsahibələri və bəyanatları. 2004-cü il /23.04.2021/ https://files.preslib.az/site/ialiyev/2004.pdf
8. Gürcüstan. İkitərəfli münasibətlər. /23.04.2021/ https://mfa.gov.az/az/content/218/gurcustan
9. Gürcüstanın Prezidenti Salome Zurabişvilinin rəsmi qarşılanma mərasimi olub /27.02.2019/ https://president.az/articles/32063?fbclid=IwAR0oytVB82yYCSxCBsiWDh5L9_kPGzaMM5-g-pRR2BvtIqit_DHiLIAoMcw
10. Gürcüstanın Prezidenti xanım Salome Zurabişvilinin şərəfinə veriln rəsmi ziyafət /27.02.2019/ https://files.preslib.az/projects/xs/fes2/2019.pdf
11. В.Л.Величко. "Кавказ" (1886-1895) Об армянах /23.04.2021/ https://lesnoj-ded.livejournal.com/14455.html
12. И.Г.Чавчавадзе. Армянские ученые и вопиющие камни /23.04.2021/ https://amsi.ge/istoria/somx/kamni.html
13. Kəlbəcərdə ermənilərin “tarix” istehsal edən sexi aşkarlandı /19.11.2020/ https://bizim.media/az/region/3074/kelbecerde-ermenilerin-tarix-istehsal-eden-sexi-askarlandi-fotolar/